**N Ə Ş R L Ə R**

# Fonetika. Yeni tədqiqatlar

***Nabatəli Qulamoğlu***
DİM yanında İctimai Şuranın üzvü, təhsil eksperti. Azərbaycan.
E-mail: n_palangov@mail.ru
https://orcid.org/0000-0002-6241-4490

**XÜLASƏ**
Məqalədə yenicə çapdan çıxmış "Müasir Azərbaycan dili" kitabı qismən təhlil edilmişdir. Təhlil prosesində əsas diqqət funksional fonetikaya yönəlmişdir, çünki bu sahə geniş araşdırma tələb edir. Məqalədə həmçinin müəlliflərin fonetika elminə fərqli aspektlərdən yanaşıldığı qeyd edilib. İlk növbədə, fonetika elmini təşkil edən seqmentlər arasındakı bağlılığa önəm verilib. Çünki artikulyar və akustik fonetikanı geniş araşdırmadan funksional fonetika təhlil edilə bilməz.
Məqalədə Azərbaycan fonoloqlarının elmi araşdırmaları təhlil edilmiş və bu elmi tapıntıların böyük zəhmət hesabına ərsəyə gəldiyi vurğulanmışdır. Həmçinin funksional fonetika sahəsində çalışan alimlərin Azərbaycan dilinin özəlliklərini nəzərə alması da diqqətdən yayınmamışdır.

**AÇAR SÖZLƏR**
fonetika, fonologiya, fonem, allofon, səs tipləri

**MƏQALƏ TARİXÇƏSİ**
göndərilib: 19.11.2021
qəbul edilib: 26.11.2021

**MƏQALƏNİ ÇAPA MƏSLƏHƏT BİLƏN**
Filologiya elmləri doktoru, professor İsmayıl Kazımov.

**PUBLICATIONS**

# Phonetics. New research

***Nabatali Gulamoghlu***
Member of the Public Council under the State Examination Center, education expert.
Azerbaijan. E-mail: n_palangov@mail.ru
https://orcid.org/0000-0002-6241-4490

**ABSTRACT**
The article partially analyzed the book "Modern Azerbaijani Language". The focus is on functional phonetics, as this area requires extensive study. It was noted that the authors approach the science of phonetics in various aspects. First of all, more attention is paid to the relationship between the segments that make up the science of phonetics. The fact is that without a wide study of articular and acoustic phonetics, it is impossible to analyze functional phonetics.
The article contains enough scientific finds of Azerbaijani phonologists. It is emphasized that such scientific finds are formed into the cost of hard work. It is possible that our scientists working in the field of functional phonetics take into account the peculiarities of the Azerbaijani language.

**KEYWORDS**
phonetics, phonology, phoneme, allophone, sound types

**ARTICLE HISTORY**
Received: 19.11.2021
Accepted: 26.11.2021

## Giriş / Introduction

Azərbaycan Milli Elmlər Akademiyası Nəsimi adına Dilçilik İnstitutu tərəfindən hazırlanmış "Müasir Azərbaycan dili (Fonetika və fonologiya)" kitabı 2019-cu ildə "Elm" nəşriyyatında nəşr edilmişdir. Bu, 50 il bundan əvvəl yazılmış 90 səhifədən ibarət dörd cildlik akademik qrammatikanın I cildidir. Yeni dərc edilmiş cilddə fonetika və fonologiya sahəsində yeni araşdırmalar öz əksini tapmışdır. Kitabın məzmunu ilə ümumi tanışlıq onu deməyə əsas verir ki, dilçilik sahəsində daha bir uğurlu addım irəliyə atılmışdır. Adətən, ağır zehni əmək tələb edən işlərin öhdəsindən gəlmək üçün elmi müəssisələr öz əməkdaşlarını səfərbər edir. Bu kitabda isə Nəsimi adına Dilçilik İnstitutunun əməkdaşları ilə bərabər, linqvistika sahəsində dəsti-xətti olan alimlərin düşüncə və yanaşmalarının da şahidi oluruq. Bu isə, əsas yeniliklərdən biri hesab olunur.

Elmi məqalələrin ardıcıl və sistematik təqdimatı elmi əsər haqqında yığcam məlumat əldə etməyə kömək edir. Bu cəhətdən, professor Qəzənfər Kazımovun dilimizin fonetik strukturunun tədqiqi haqqında araşdırmaları xüsusi önəm kəsb edir. Tədqiqatda vahid etnogenezin təşəkkül dövrü, Azərbaycan dilinin geniş coğrafiyası, formalaşma tarixi, "türk" sözünün etimologiyası və digər vacib məsələlər öz əksini tapmışdır. Müəllif "Azərbaycan" sözünün evolyusiyası haqqında müfəssəl məlumat verərək, bunu təkzibolunmaz faktlarla zənginləşdirmişdir. Bununla da, Azərbaycan türklərinin mənşəyi barədə bilərəkdən verilmiş yanlış məlumatlar elmi əsaslara söykənərək təkzib edilmişdir. Əlbəttə, belə olan halda tədqiqat işinin dəyəri dilçilik sərhədlərini aşır, çünki söhbət bir millətin şanlı tarixini doğru təqdim etməkdən gedir. Maraqlı məqamlardan biri də, məhz Azərbaycan dilinin adı ilə bağlı mübahisələrin siyasi aspektdən təhlil edilməsidir. Araşdırmalardan məlum olur ki, qısa zaman kəsiyində dilimizin adının üç dəfə dəyişdirilməsi də məhz bununla bağlıdır.

Biz bu nəşrdə fonetikanın müxtəlif müstəvilərdən öyrənilməsinin şahidi oluruq. Təbii ki, hər mövzu ilə əlaqəli fikir söyləmək imkan xaricindədir. Kitabda dilçi-alimlərimizin fonologiya haqqında fikir və mülahizələri diqqət cəlb edir, çünki bu, bütün dillər üçün ən ağrılı və mübahisəli məsələdir. Funksional fonetika barədə professorlar İ.Kazımov, F.Veysəlli, Q.Məşədiyev və dosent E.Abışovun düşüncələri maraq doğurur.

Təqdirəlayiq haldır ki, müəlliflər Azərbaycan dilinin fonetikasını müxtəlif aspektlərdən öyrənmişlər. Tədqiqat işində fərqli baxışların yer almasını da yeniliklər sırasına daxil etmək olar, çünki yalnız müxtəlif yanaşmaları emal etdikdən sonra düzgün elmi nəticə çıxarmaq mümkündür. Araşdırmalar göstərir ki, dilimizin fonetik

sistemi ənənəvi qaydada təhlil edilmiş, danışıq səsləri həm artikulyar, həm fizioloji, həm də sosial aspektlərdən təhlil edilərək, oxucuların ixtiyarına verilmişdir. Düzdür, bəzi dilçi-alimlər fonologiyanı fonetikadan ayırmağı, onu dilçilik elminin özünəməxsus sahəsi kimi öyrənməyi təklif etmişlər, amma onların böyük əksəriyyəti danışıq səslərinin fizioloji və sosial təbiəti arasında sıx əlaqə olduğunu diqqətə çatdırmaqla, fonologiya və fonetikanın birgə öyrənilməsini daha doğru hesab etmişlər. Hər hansı bir fonemi təmsil edən danışıq səsini təqdim edərkən, ilk növbədə, onu digər səslərdən fərqləndirən artikulyar və akustik xüsusiyyətləri önə çəkirik. Bundan sonra isə həmin səsin funksional keyfiyyətinə nəzər salırıq. Beləliklə, hər hansı bir danışıq səsinin təsvirində akustik, artikulyar və fonematik aspektin bir-birindən ayrılmaz olduğunu görürük. Digər tərəfdən, dilin fonetik aspekti fonematik aspektdən asılıdır. Belə ki, məşhur bir ifadədə deyildiyi kimi, "bütün yollar Romaya aparır", yəni danışıq səslərinin hər bir detalının öyrənilməsi son nəticədə dilin əsas fəlsəfəsinə xidmət edir. Bu da dilin ünsiyyət vasitəsi olma funksiyasının yerinə yetirilməsi deməkdir.

Danışıq səslərinin müxtəlif aspektlərdən öyrənilməsi prof. F.Veysəllinin "Azərbaycan dilinin funksional fonetika və fonologiyası" adlı tədqiqat işində öz əksini tapmışdır. Düzdür, başlıqda müəyyən təkrara yol verilmişdir, çünki "funksional fonetika" ilə "fonologiya" eyni anlayışlardır. Güman edirik ki, bu, diqqətsizliyin nəticəsidir.

Danışıq səslərini əhatəli şəkildə təsvir etmək üçün, bəlkə də bir insan ömrü kifayət etməz. Rus dilinin fonetikası ilə aparılan uğurlu müqayisələr bir sıra yeniliklərin meydana gəlməsinə səbəb olmuşdur:

- Hər şeydən əvvəl, müəllif dilimizin özəl xüsusiyyətlərinə istinad edərək, fonemə yeni tərif vermişdir [1, s.228]. Bu tərifdə başlıca yenilik ondan ibarətdir ki, dilçi-alim fonemi struktur baxımdan bölünən, xətti baxımdan isə özündən kiçik hissələrə bölünə bilməyən dil vahidi hesab edir.
- Tədqiqat işində Azərbaycan dili fonologiyasının mübahisəli məsələləri öz əksini tapmışdır. Məqalədə qeyd edildiyi kimi, mübahisəli məsələlər ya əcnəbi, ya da dialekt sözlərin səs tərkibi ilə bağlıdır.
- Diqqətəlayiq hallardan biri də budur ki, prof. F.Veysəlli danışıq səslərini lazımi səviyyədə təhlil etmək üçün dildə kombinator və mövqe dəyişmələrini araşdırmışdır. Bu məsələ fonetika elmi üçün fundamental xarakter daşıyır, lakin bir çox dilçilər məlum dəyişmələrin fərqləndirilməsinə diqqət yetirmirlər. Hal-hazırda əksər sözlərin tələffüzü ilə bağlı mübahisələrin kökündə məhz kombinator və mövqe dəyişmələrini fərqləndirməmək dayanır.

- Moskva fonologiya məktəbinin (MFM) nümayəndələri hesab edirlər ki, /ı/ fonem deyil, o, /i/ foneminin variantıdır, çünki həmin səslərdən istifadə pozisiyadan asılıdır. Güman etmək olar ki, Azərbaycan dilindəki /ı/ fonemini rus dilindəki oxşar səslə müqayisə etmək o qədər də doğru deyil. Amma bəzi dilçi-alimlərin arqumentlərini Azərbaycan dili üçün də keçərli hesab etmək olar. Belə ki, hər iki dildə /ı/ fonemi ilə başlayan söz yoxdur. Bütün bunlara baxmayaraq, Azərbaycan dilində /ı/ fonemi sözü fərqləndirə bilir (müqayisə et: [aşıq] – [aşiq]). Bu cəhətdən F.Veysəllinin /ı/ fonemini müstəqil hesab etməsi, fikrimizcə, doğru yanaşmadır və onu da yeniliklər sırasına aid etmək olar.

Yuxarıda söylənilən müsbət hallarla yanaşı, tədqiqatçıların diqqətindən yayınan bəzi məsələlər də vardır. Hər şeydən əvvəl, müəlliflər dilçi-alim, professor Ə.Dəmirçizadənin fonetika haqqında düşüncələrinə əsaslanmışlar. Elmi məqalələrdə qeyd olunmamasına baxmayaraq, fonem haqqında nəzəriyyə dilçiliyimizə rus dilindən gəlmişdir. Fonologiyanın tədqiqi üçün rus dilində zəngin material vardır. Funksional fonetikanın öyrənilməsi problematik olduğu üçün rus alimləri iki cəbhəyə ayrılmışlar: Leninqrad fonologiya məktəbi (LFM) və Moskva fonologiya məktəbi (MFM). “Fonem” anlayışına yanaşmada vaxtilə bu iki məktəb arasında ciddi fikir ayrılıqları mövcud olmuş və qalmaqda da davam edir. Prof. Ə.Dəmirçizadənin fonoloji nəzəriyyəsi, əsasən, MFM-in müddəalarına istinad edir. Əlbəttə, biz o fikirdə deyilik ki, MFM-in mövqeyindən çıxış etmək doğrudur. Azərbaycan dilçiliyi üçün əsas məsələ dilimizin fonetik tərkibinin hansı məktəbin funksional fonetika nəzəriyyəsinə uyğun gəlməsindədir. Bəlkə də, alimlərimiz adı çəkilən fonologiya məktəblərindən heç birinin nəzəriyyəsini qəbul etməyib, tamamilə yeni yanaşma təqdim edərlər. Bu cəhətdən onların bir sıra məsələlərə münasibəti xüsusilə maraq doğurur:

- MFM-in davamçıları hesab edirlər ki, fonemlərin tərkibini müəyyən etmək üçün yalnız rus dilinə məxsus olan sözlərdən istifadə edilməlidir. LFM-in nümayəndələri isə fonemin tərkibini müəyyən etmək üçün həm milli, həm də əcnəbi sözlərdən istifadəni doğru hesab edirlər. F.Veysəllinin tədqiqatlarında əcnəbi sözlərdən geniş istifadə edilmişdir [1, s.229]. Problemə praktik yanaşdıqda müəlliflərə haqq qazandırmaq olar. Belə ki, rəsmi statistikaya görə, dilimizin lüğət fondunun 60 %-i milli sözlərdir. O zaman sual yaranır: Əgər bu qədər sözlər nəzərə alınmasa, funksional fonetikanı hansı baza əsasında qurmaq olar? Digər tərəfdən yanaşsaq, əcnəbi sözlərin bazası əsasında fonoloji nəzəriyyəni necə qurmaq olar? Axı dilimizdə tələffüz formaları diametral əks olan əcnəbi sözlər qrupu vardır. Belə çıxır ki, Azərbaycan dilinin funksional fonetikası üç dilin (Azərbaycan, ərəb-fars və rus)

fonetik qanunları əsasında öyrənilməlidir. Deyək ki, [fanalogiya] sözünü funksional cəhətdən izah edərkən bildirməliyik ki, burada /o/ foneminin bir-birindən fərqli olan üç allofonu vardır, çünki tələffüz qaydasına görə, vurğudan əvvəlki 1-ci heca ilə 2-ci hecadakı sait fərqlidir. Vurğulu hecanın, eləcə də ondan əvvəlki iki hecanın saitləri /o/ fonemini təmsil edir. Məhz bu cəhətlər nəzərə alınmadığı üçün orfoepiya lüğətində bir-birinə diametral zidd olan hallarla da rastlaşırıq.

- Prof. F.Veysəlli yazır: "Bəzən elmi ədəbiyyatda yanlış olaraq elə fikir yürüdülür ki, guya dildə iki cür səs var: məna fərqləndirən səslər, bunlara fonem deyirlər və məna fərqləndirməyən səslər, bunlara isə variantlar və ya allofonlar deyirlər. Bu, kökündən yanlış fikirdir. Dildə fonem olmayan səs yoxdur. Digər tərəfdən də elə bir səs yoxdur ki, o, hansısa bir fonemin təmsilçisi olmasın" [1, s.228].

"Dildəki səsləri məna yaradan və yaratmayan səslərə bölmək kökündən yanlışdır" və "dildə fonem olmayan səs yoxdur" hökmləri eyni səciyyə daşıyır, çünki fonemin əsas funksiyası diferensiasiya yaratmaqla məna çatdırmaq və bununla da ünsiyyət yaratmaqdır. Bu fikirləri qəbuledilməz hesab edərək, məsələyə iki aspektdən yanaşaq:

1. Danışıq səsləri saysız-hesabsız (hətta bunu da iddia edən dilçilər vardır) olmasa da, onların sayı çox olduğundan, bəzən bir-birindən fərqləndirmək olmur. Hər bir canlı kimi, insan da bənzərsiz anatomik fizioloji quruluşa malikdir. Gözümüzə eyni cür görünən qarışqaların belə bir-birindən fərqli xüsusiyyətləri mövcuddur. Buradan belə nəticə hasil olur ki, səsi tələffüz edən hər bir şəxs fərddir və onun danışıq üzvləri təbiətən fərqli olduğu üçün eynən onun kimi heç kim tələffüz edə bilməz. Bu barədə olan fikirləri vaxtilə dilçi-alimlər İ.A.Beduen de Kurtene və L.V.Şerba da təqdim etmişlər. L.V.Şerba belə müqayisə edir: "Hər bir tozağacı ayrıca götürüldükdə digərindən fərqlənir, amma bu, bizə onu deməyə əsas vermir ki, 1-ci tozağacı, 2-ci isə palıddır".

Beləliklə, biz yalnız o səsləri qavrayırıq ki, həmin səslər tipikləşmiş olsun. Məhz buna görə də MFM-in nümayəndələri fonemi "səs tipi" kimi səciyyələndirirlər. Deyək ki, /r/ səsinin bir neçə formada pəltək tələffüzü vardır. Əslində, müəllif müxtəlif səslərin fərqli dillərdə keyfiyyət məsələsinə ötəri toxunur. Amma konkret faktlar meydanda olmadığı üçün bu məsələ mücərrəd olaraq qalır. Tipikləşməmiş çoxsaylı səsləri ayırd edə bilmədiyimizdən, həmin səslər sözlərin fərqləndirilməsində heç bir rol oynaya bilmir. Aydın məsələdir ki, ayırd edə bilmədiyimiz səsə qiymət vermək də mümkün deyil.

2. Hər bir səs ayrı-ayrılıqda deyil, müqayisədə fonem kimi müəyyən edilə bilər. Deyək ki, "nar" və "dar" sözlərində iki fonem (/n/, /d/) vasitəsilə sözlər bir-birindən

fərqləndirilir. Digər səslərə mövcud kontekstdə fonem deyə bilmərik, çünki fonem özünü realizə etmək imkanı tapmayıb. Həmin səsləri fonem kimi tanımaq üçün ayrı fonem cərgəsi tələb olunur: [at] – [ot] (/a/ və /o/ fonemi), [qol] – [qor] (/l/ və/ r/ fonemi üçün). Düşünürük ki, mütəxəssislərimiz bu istiqamətdə yeni araşdırmalar apararaq, dilimizin fonoloji sisteminə böyük töhfə verə bilərlər.

Prof. F.Veysəllinin toxunduğu məsələlər içərisində o da qeyd edilir ki, hər hansı bir səs öz keyfiyyətinə görə bir dildə əhəmiyyətsiz, digərində isə əhəmiyyətli sayıla bilər. Biz əhəmiyyətli dedikdə, səsin fonem rolunda çıxış etməsini, sözləri fərqləndirmək potensialının olmasını nəzərdə tuturuq. Təəssüf ki, söylənilən nəzəri məlumat praktik nümunələrlə möhkəmləndirilməmişdir. Deyək ki, Azərbaycan dilindən fərqli olaraq, ləzgi dilində dodaqlanan samitlər sözləri bir-birindən fərqləndirmək xüsusiyyətinə malikdir. Belə bir nümunəyə nəzər salaq: [qor] və [qur] sözlərində /o/ və /u/ səsləri eyni əhatə dairəsində olduğuna görə ləzgi dilində sözləri fərqləndirmək üçün yeganə vasitə hesab edilir.

Dosent E.Abışov “Danışıq səsi və fonem anlayışı” adlı yazısında diqqəti fonemə verilmiş tərifə yönəltmişdir. Müəllif öz mülahizələrində dilçi-alimlərimiz A.Axundov və F.Veysəlliyə istinad etmişdir. Maraq doğuran məsələlərdən biri də, bu müəlliflərin “fonem” anlayışına Azərbaycan dilinin özəl xüsusiyyətləri baxımından qiymət verməléridir. E.Abışov Leninqrad fonologiya məktəbinin yaradıcısı L.B.Şerbadan sitat gətirərək, onu təhlil etməyə cəhd etmişdir. Həmin sitatda yazılır: “...biz görürük ki, canlı danışıqda bizim düşündüyümüzdən xeyli artıq miqdarda cürbəcür səslər tələffüz olunur və bunlar da müəyyən dildə sözləri və onların formalarını fərqləndirmək qabiliyyətinə malik olan, yəni insan ünsiyyəti məqsədinə xidmət edən, nisbətən böyük olmayan səs tiplərində birləşir. Ayrı-ayrı danışıq səsləri haqqında danışarkən elə bu səs tipləri nəzərdə tutulur. Biz onları fonem adlandırırıq” [1, s.320]. E.Abışov L.V.Şerbanın fikirləri ilə razı olmadığını bildirir və əks-arqument kimi dilçi-alim A.Axundova istinad edir: “Göründüyü kimi, tədqiqatçı fərq qoymadan hər bir dildə sözləri və onların formalarını fərqləndirən və ünsiyyətə xidmət edən bütün səsləri fonem hesab edir” [1, s.320].

Bizə belə gəlir ki, müəllif L.V.Şerbanın dediklərini diqqətlə analiz etməmişdir. Sitatda rus alimi səs çoxluğundan danışsa da, yalnız səs tiplərinin ünsiyyətə xidmət etdiyini vurğulayır. L.V.Şerbanın fikirləri MFM-in fonemə verdiyi tərifdə belə öz əksini tapmışdır (fonem səs tipidir). A.Axundovun fikirlərinə əsaslanan müəllif hesab edir ki, fonem heç də sözləri və onun formalarını bir-birindən ayırmağa xidmət etmir, o, sözlərin və onların formalarının səs cildini dəyişdirir [1, s.320].

A.Axundov burada qeyri-müəyyən "ayırmaq" sözündən istifadə etmişdir. Əgər həmin söz məna fərqini ayırmaq mənasında işlənmişdirsə, o, heç də L.V.Şerbanın verdiyi tərifə zidd deyil. A.Axundovdan gətirilmiş növbəti fikir də bunu sübut edir: "Dil vəzifəsi olan danışıq səslərini, yəni leksik və qrammatik mənası olan dil vahidlərini (belə dil vahidlərini morfem adlandırırlar) bir-birindən fərqləndirən danışıq səslərinə fonem deyilir". A.Axundovun verdiyi tərifdə məşhur fonoloqların söylədiklərindən fərqli heç bir şey yoxdur. Əksinə, fonemə verilən konseptual tərifdə özünə yer tapmış xüsusiyyətlərdən biri burada yoxdur, yəni fonem söz, onun formalarını, morfemləri fərqləndirərkən onların eyniliyinə xələl gətirmir. Sadə şəkildə izah edək: [kənt] və [kəndə] sözlərində forma fərqləndirilmişdir. Biz hər iki sözdəki son samiti fərqli tələffüz etməyimizə baxmayaraq, bu tələffüz onların eyniliyinin, yəni |d| foneminin variantları olduğunu dərk etməkdə bizə mane olmur. Burada daha bir məqama diqqət etmək lazım gəlir. A.Axundovun dediyi "səs cildini dəyişmək" ifadəsi fonemi səsdən fərqləndirən kriteriya deyil, çünki fonem məzmunu (leksik və ya qrammatik) ifadə etmək üçündür. Məzmun və forma fəlsəfi kateqoriyadır, onlar bir-birindən ayrı təsəvvür edilə bilməz. Deməli, istənilən məzmunu ifadə etmək üçün formanın olması mütləqdir, bunu yenilik kimi qələmə vermək isə yanlışdır.

E.Abışov fonemin tərifindəki "məna fərqləndirir" ifadəsinin doğru olmadığını vurğulayır. Bununla da, müəllif fonemin səsdən fərqli olaraq sosial anlayış olduğunu inkar etmiş olur. Bu fikirlərin ardınca, yenidən A.Axundovdan məlum sitatı nümunə gətirir: "Dil vəzifəsi olan danışıq səslərini, yəni leksik və qrammatik mənası olan dil vahidlərini (belə dil vahidlərini morfem adlandırırlar) bir-birindən fərqləndirən danışıq səslərinə fonem deyilir" [1, s.320]. Burada da aydın görünür ki, fonem sözləri və ya onların formalarını bir-birindən fərqləndirir. Əgər bu baş vermirsə, insanlar bir-birini necə başa düşərlər? Ona görə də sosial xarakter fonemi fərqləndirən başlıca əlamətdir.

Tədqiqatda E.Abışov "danışıq səsləri və fonem arasındakı fərqin" olduğunu söyləsə də, bunun nədən ibarət olduğunu açmır. Təbii ki, fonem danışıq səsidir, amma hər danışıq səsi fonem ola bilmir. İki anlayış arasındakı münasibət məhz bundan ibarətdir. Danışıq səsi və səs tipi bir-birindən fərqlidir.

Tədqiqat işləri içərisində fonosintaksis mövzusunun təhlili də xüsusi maraq kəsb edir. Prof. İ.Kazımov "Sintaqm fonosintaksisin obyekti kimi" adlanan elmi araşdırmasını məhz bu problemə həsr etmişdir.

“Sintaqma” geniş anlayışdır. O, sintaksis, sinkretika və s. sözlərlə eyni kökdən hesab edilir. Bu sözlərin hamısını “birgə”, “birləşmə” mənaları bir-birinə yaxınlaşdırır.

Prof. İ.Kazımov İsveçrə dilçi-alimi F.de Sössürə istinad edərək, sintaqmatik fonetikanı Azərbaycan dilinin özünəməxsus keyfiyyətlərinə uyğun şəkildə təhlil etmiş, mövqe və kombinator səsdəyişmələr, onların növləri orijinal qaydada izah edilmişdir. Yazıda öz əksini tapmış yeniliklərdən biri də, cümlənin sintaqmalara ayrılmasında rol oynayan amillərin müəyyən edilməsidir. Ən başlıcası, müəllif sintaqmatik tərkibə fonosintaktik müstəvidən yanaşmışdır. O bildirmişdir ki, belə problemli məsələlərə həm fonetika, həm də sintaksis qanunlarından yanaşmaq lazımdır.

Beləliklə, bir çox fərqli baxışları özündə əks etdirən “Müasir Azərbaycan dili” kitabında dilimizin fonoloji sisteminin öyrənilməsinə daha çox diqqət ayrılmışdır. Bu isə, günümüzün ən aktual məsələlərindən biri hesab edilir.

**Nəticə / Conclusion**

Dilin ictimai hadisə olması hamıya məlumdur. Deməli, zaman keçdikcə dil də inkişaf edir. Dilin inkişafı hərtərəfli baş verir. Bu, özünü həmin dilin səs sistemində, leksik tərkibində və qrammatik quruluşunda göstərir. Digər tərəfdən, dilçilik elminin müxtəlif sahələri yenilənir. Son zamanlar dilin insanlar arasında ünsiyyət vasitəsi olması funksiyasına xüsusi önəm verilir. O da məlumdur ki, indiyə kimi tədris proqramlarında qrammatik qaydaların mənimsənilməsinə daha çox diqqət yetirilib. Hazırda isə ümumtəhsil məktəblərində dil kommunikativ aspektdən öyrədilir. Mətnlər üzərində aparılan hərtərəfli təlim hərəkətlərini buna misal göstərmək olar. Bu cəhətdən, fonologiya elmi təkmilləşir, yenilənir, müxtəlif elmi baxışların emalı nəticəsində daha da mükəmməl bir sahəyə çevrilir. Məhz bu baxımdan da, "Müasir Azərbaycan dili (Fonetika və fonologiya)" kitabının əhəmiyyəti danılmazdır.

**İstifadə edilmiş ədəbiyyat / References**


1. Müasir Azərbaycan dili (Fonetika və fonologiya), I hissə. (2019). Nəsimi adına Dilçilik İnstitutu. Bakı, Elm. 733 s.
2. Бондарко Л.В., Л.А.Вербицкая., М.В.Гордина. (2004). Основы общей фонетики. Филологический факультет СпбГУ. Москва, Академия. 160 с.
3. Касаткин Л.Л. (2014). Современный русский язык: Фонетика. Москва, Академия. 256 с.
4. М.В.Панов. (1979). Современный русский язык. Фонетика. Москва, Высшая школа 2. 256 с.
5. Матусевич М.И. (1976). Современный русский язык: Фонетика. Москва, 288 с.
6. Шаманова М.В., Талицкая А.А. (2018). Фонетика русского языка. Исторический и синхронические аспекты (Учебное пособие). Ярославль, 103 с.